**İkinci söhbət. BİZ NİYƏ DEVRİLDİK?**

Bir görün fitnə-fəsad törədənlərin axırı necə oldu!

(Qur’an, "Əraf" surəsi: 86)

Bu sorğuya cavab verərkən bütün gerçəkləri ortaya qoymadığını özü də gizlətmir, bir çox faktlarınsa açıqlanması zamanının yetişmədiyini bildirirdi. Təəssüf ki, hətta mənim özüm də ondan öyrəndiyim neçə-neçə həqiqəti hələ üzə çıxara bilməyəcəyəm, çünki cəmiyyətdə sarsıntıların yaranmasını istəmirəm. Ancaq sevimli oxucumdan bircə xahişdə bulunacağam - Elçibəyi hakimiyyəti təhvil verməkdə suçlayanların hər biri öz-özündən soruşsun: "O hakimiyyəti qorumaq, möhkəmlətmək və yaşatmaqçün mən nə etmişdim və hakimiyyətin əldən getməsində mən tam günahsızammı?".

"MTN də, MN də, DİN də öz kadrlarımızla yetərincə təmin edilmədiyinə görə həmin nazirliklər bizim əleyhimizə çevrildi"

Hakimiyyəti qorumaqdan ötrü ilk növbədə etibarlı güc strukturları lazımdır. Hər şey bir yana, biz Rusiyanın nüfuz dairəsindən çıxmağa çalışırdıq, istəyirdik ki, Avropaya, ABŞ-a, ümumiyyətlə, qabaqcıl dünyaya qoşulaq, siyasətimizin istiqamətini tam dəyişək. Bundan ötrü, əlbəttə, məhz ÖZ güc strukturlarımızı yaratmağa ehtiyac vardı. Ancaq hakimiyyətimizin uğursuz sonluğu bu sahədə ciddi dəyişikliklər edə bilmədiyimizi göstərir. Yanılmıram ki?

Siz, sözsüz ki, Milli Təhlükəsizlik Nazirliyi, Müdafiə Nazirliyi və Daxili İşlər Nazirliyinin 4 iyun ərəfəsində, hətta ondan da qabaq fəaliyyətini nəzərdə tutursunuz. Ancaq unutmayaq ki, onlarda bizim hazır kadrlarımız yoxdu. Naziri, yaxud baş prokuroru yeniləşdirməklə köklü kadr dəyişikliyi baş vermir - müəssisənin işində həlledici rol oynayan orta pilləli kadrlar öz yerində qalır. Onları təcrübəli yeni kadrlarla əvəz etmək asan deyil - buna müəyyən zaman lazımdır ki, 3 ilə, 5 ilə yetişsinlər, formalaşsınlar. Bu səbəbdən də biz həmin orta pilləni dağıda bilmədik, o da 3-4 ay bizə qulaq asandan sonra başladı əleyhimizə işləməyə. Beləliklə, MTN də, MN də, DİN də öz kadrlarımızla yetərincə təmin edilmədiyinə görə həmin nazirliklər bizim əleyhimizə çevrildi.

Bu nəyin təsiri nəticəsində oldu? Rusiyanın, yoxsa...

Azərbaycanda öz hakimiyyətini xalq hərəkatına görə itirmək istəməyən olduqca güclü təbəqə - həmin nazirliklərdə neçə-neçə illər boyunca formalaşmış orta pillə məmurları özlərinə sığışdıra bilmirdilər ki, "uşaq-muşaq" (axı onlar indiyədək məsul vəzifələrdə, demək olar ki, cavan adamları görməmişdilər), "yetim-yesir" (heç kəsin himayəsi olmadan kasıb, tam pulsuz adamın da vəzifə tutmasına onlar alışa bilmirdilər) gəlib onlara başçılıq edəcək. Onlar sovet bürokratik aparatında yağlanmış, piylənmiş təbəqəydi və, təbii ki, bizi qəbul etməyəcəkdi. Ancaq biz də onu birdən-birə sındırıb yerini yeni mütəxəssislərlə doldura bilməyəcəkdik. Bax, bu iki bəlanın arasında qaldıq. Onlar 3-4 aydan sonra özlərinə gəldilər və xəyanət etdilər, çünki xalq hərəkatından qorxmuşdular, yerlərində tir-tir əsirdilər. Xalq hakimiyyətindən razı deyildilər. Ona görə də fürsətdən istifadə edib dedilər ki, görün sizin başınıza nə oyun gətirəcəyik və gətirdilər də. Buna qarşı müqavimət göstərirdik, ancaq müqavimət zəifdi. Rus kəşfiyyatı da onlara kömək etdi. Həmin qüvvələr də hakimiyyəti devirdi.

Bəy, icra hakimiyyətləri tamamilə bizim özümüzdəndi, ancaq onların da iqtidarı qorumağa gücü çatmadı.

İcra hakimiyyətinin əlində nə vardı ki?! Nə polis var, nə də milli təhlükəsizlik orqanları. Siz təsəvvür edin - Gəncədə hadisə olub, mən 3 gün bu hadisələr haqqında nə MTN-dən, nə də DİN-dən dəqiq məlumat ala bildim.

Müdafiə naziri Dadaş Rzayev də aradan çıxdı, tapılmadı.

Bəli. Hərbçilər əməlli-başlı xəyanət etdilər. Mən sonradan bildim ki, bizim hərbin başında duranların hamısı (bir-iki nəfəri çıxmaqla) Rusiya Baş Kəşfiyyat İdarəsinin əlaltılarıdır.

Bir ildən sonra keçmiş SSRİ-nin hər yerində olduğu kimi Azərbaycanda da xalq hakimiyyətini zorla devirdilər və keçmiş kommunistlər bu dəfə hakimiyyətə qayıdanda demokrat libasına büründülər. Bizi əlləri üstündə, sevinc içərisində hakimiyyətə gətirən minlərcə adam öz doğma hakimiyyətinin məhv edilməsini soyuqqanlılıqla qarşıladı. Məsələn, iqtidarımızın son günlərində - iyunda həmrəylik bildirməkçün Prezident Aparatının qarşısına çox az adam toplaşırdı. Bizi bir il qabaq böyük coşquyla hakimiyyətə gətirən insanların belə laqeydliyinə, soyuqqanlılığına əsas səbəb, sizcə, nəydi?

Birincisi, xalq yeni hakimiyyətin mahiyyətini düzgün qiymətləndirə bilmədi. Bu, indiyə qədər görünməmiş yeni bir hökumətdi. Onun mahiyyətini köhnə sovet, kommunist psixologiyasıyla dəyərləndirmək mümkün olmayacaqdı. 70 ildən artıq sosialist təfəkkürüylə tərbiyə olunmuş insanlar bazar iqtisadiyyatı qanunlarının cəmiyyətdə tətbiqini gördükcə vahiməyə düşür, dəhşətə gəlirdilər. Həlledici kütləsi kasıblardan ibarət olan xalqımızda dövlətli insanlara bir gizli kin də vardı və adamlar bəlkə də onlardan bu sərvəti necə qazandıqlarını soruşacağımızı gözləyirlərmiş; bunun əvəzində hamının dövlətli olmasına çağırmağımızı eşidəndə və həqiqətən də çox pullu adamların meydana çıxdığını görəndə onlar bizi "dönük" saymağa başladılar. Təbii ki, bizi belə dəyərləndirmələri tam yanlışdır, ancaq bircə şeydə onlara bütünlüklə haqq qazandırıram - biz hamının yaxşı tanıdığı harınlamış cinayətkarları vaxtında və prinsipiallıqla cəzalandırmadıq!..

İkincisi, görünür, biz xalqa müstəqil dövlət quracağımızı və həm bütövlükdə dövlətin, həm də əhalinin iqtisadi vəziyyətini köklü surətdə yaxşılaşdıracağımızı vəd edəndə insanlar bunun ildırım sürətiylə - bir neçə ayın içində baş verəcəyini gözləyirmiş; bizi özününkü saydığına görə həddən artıq şey uman xalq arzularının çin olmasının çox ləngidiyini görəndə bizdən "küsdü", halbuki biz, fikrimcə, yetərincə sürətlə irəliləyirdik və ikicə il də hakimiyyətdə qala bilsəydik bütün sözlərimizə əməl edəcəydik.

Üçüncüsü, Moskva kəşfiyyatı, İran kəşfiyyatı və öz içimizdə olan mafioz, xəyanətkar qruplar hərtərəfli təbliğat apararaq xalqı yolundan azdırdılar, aldatdılar, çaşdırdılar. Xalq da inandı ki,

"ağzıyumşaqlar" getsə, "dəmirəllilər" gəlsə yaxşı olacaq. Nəhayət, həmin "dəmirəllilər" gəldilər və xalq onların nə olduğunu əyani gördü, necə böyük səhv etdiyini başa düşdü. Bundan sonra yəqin ki, xalq öz hakimiyyətini görəndə "bu, mənim hökumətimdir" deyə müdafiə edəcək.

Azərbaycan Respublikasının ilk həqiqətən müstəqil və milli hakimiyyətini qoruyub saxlamaq mümkündümü? Çökmənin başlıca səbəbləri nəydi və onun səbəbkarlarını aşkarlamaq mümkündürmü? Məsələn, indi bəzən söyləyirlər ki, hakimiyyəti qorumaq, saxlamaq olardı - əvvəlcədən bir sıra qüvvələr əzilsəydi belə problem yaranmazdı və s. Sizcə, bizim hakimiyyət yaşaya bilərdimi?

Şəksiz, yaşaya bilərdi. Sadəcə olaraq, bizdə hakimiyyəti nə cür qorumağın təcrübəsi olmadığına görə onu saxlaya bilmədik. 4 iyun qiyamı yatırılsaydı məsələ birdəfəlik həll olunacaqdı. Çox təəssüf ki, bizə qarşı duran rus imperiyasının, İranın kəşfiyyatı bizdən daha güclü, daha təcrübəliydi. Qiyamın başçılarını müdafiə edən qruplar da burada fəal iştirak etdilər.

Burada ikinci bir məsələ var - hakimiyyəti saxlamaqçün biz hökmən diktaturanın, yaxud totalitar rejimin tələb etdiyi prinsiplərdən istifadə etməliydik, bizsə heç vəchlə buna getmədik.

Gəncə qiyamını yatırmaq olardımı? Məsələn, Pənah Hüseynov deyir ki, olardı.

Gəncə qiyamını yatırmaq olardı, amma bu zaman ən azı 50-60 nəfər öldürüləcəkdi.

Onsuz da, öldürüldülər - prezident qvardiyaçıları...

Onları mən öldürtmədim ki! Mən öz vətəndaşımı öldürtməyi bacarmıram. Güc nazirlikləri öz vəzifə borclarını yerinə yetirməliydi, ancaq yetirmədi. Asiləri yatırtmaq prezidentin deyil, güc nazirliklərinin, prokurorluğun işidir. Mən onlara əmr verə bilməzdim ki, vətəndaşlarım bir-birini qırsın. Müharibə aparan ölkədə buna yol vermək olmaz. Prezident kimdir ki, əmr versin ki, get, filankəsi öldür?!

Ancaq Rövşən Cavadov - XTPD dövlətə qarşı silah qaldıranda Heydər Əliyev üsyanı yatırtdı...

Mən mətbuatda da bildirmişəm ki, Heydər Əliyev düzgün iş görmədi. Bunun üstündə qəzetlər məni tənqid etdilər ki, Rövşənin tərəfini saxlayırsan; mən onu müdafiə etmirəm - ağ bayraq qaldırılmışdısa hökmən barışığa gedilməliydi, qan tökülməməliydi. Budur bizi 4 iyunda vətəndaş müharibəsi başlamaqda, qan tökməkdə suçlandıran Heydər Əliyevin səhvi! Niyə tutalım hökuməti müdafiə edənlərdən 30 nəfər, hökumətə qarşı çıxanlardan 100 nəfər ölməliydi?! Axı hər iki tərəfdən ölənlər öz millətimizin balalarıdır!

Bəy, Siz Heydər Əliyevin Ali Sovetin sədri seçilməsinə tərəfdardınız və deputatları da onu seçməyə çağırdınız. Bu hərəkətinizi sonradan H.Əliyev hakimiyyətinin legitimləşdirilməsinə, dünya birliyinin onu qiyamla deyil, demokratik yolla seçilmiş prezident kimi tanımasına şərait yaratmaq kimi qiymətləndirmirsiniz ki?

Qətiyyən yox! Heydər Əliyev legitim prezident deyil. Biz onu Bakıya çağıranda danışmışdıq ki, onu baş nazir təyin edəcəyik, sonra razılaşdıq ki, o, Milli Məclisin sədri olacaq və bir yerdə qiyamı yatırandan sonra Azərbaycanın dərdlərini də birgə çözəcəyik. Bu, Pənah bəylə də, İsa bəylə də, başqalarıyla da razılaşdırılmışdı. Sadəcə olaraq, H.Əliyev sədrliyi ələ keçirəndən sonra prezidentlik uğrunda mübarizəyə başladı. Mənsə bunu ondan gözləmirdim.

Bəs onun Sizi aldada biləcəyini gözləmirdiniz?

Xeyr, gözləmirdim. Ola bilsin ki, bunun mənim tərəfimdən bağışlanılmaz sadəlövhlük olduğunu deyəcəklər, ancaq onun belə edə biləcəyini həqiqətən heç cür ağlıma sığışdırmırdım.

Hər necə olsa da fakt budur ki, Sizin razılığınızla H.Əliyev gəldi və bu gün bizi istəyən də, istəməyən də, hətta H.Əliyevin özü də deyir ki, məni siz gətirdiniz, siz seçdiniz...

Bəli, Heydər Əliyevi mən seçdirdim. Bunu danmıram.

Buna peşman deyilsiniz ki?

Hakimiyyətə gətirib seçdirənədək peşman deyildim. Sonrakı fəaliyyətinə görəsə peşmanam.

Bəs niyə başqasını yox, məhz H.Əliyevi gətirdiniz?

Ona görə ki, H.Əliyevin Azərbaycanda nüfuzu vardı - kütlənin bir hissəsi onu istəyirdi. Vətəndaş müharibəsinin qarşısını almaqda onun gücünə inandığımıza görə onunla birləşməyə üstünlük verdik.

ARTIRMA

"Məni bir məsələyə görə çoxları ittiham edir. Bu ittihamlardan qaçmıram. Xalq qurultayında iki məsələ haqqında danışmaq istəyirdim, amma burada da demək olar. H.Əliyevin hakimiyyətə gətirilməsində ən böyük təqsirkar mən sayılıram. Amma, məni ittiham edənlər, o zaman siz də cavab verəcəksiniz - hamımız məsuliyyəti bölüşdürəcəyik. Mən əsas yükü öz boynuma götürürəm, amma hamısını mənim üstümə atıb qaçmayın - yenə də haqsızlıq olar. Hərə öz günahını boynuna alsın, sonra baxarıq. Çox şey olub; bütün olanlar yoxlanılmalıdır. Mübarizə və döyüş gedən vaxt kütləvi mühakimə aparılmır. Döyüş hələ qurtarmayıb, davam edir. Kim ki Azərbaycan xalqına xəyanət edib - cəzasını çəkir. Və bütün xəyanətlərin başında duran H.Əliyev də öz cəzasını çəkəcək.

Kiçik bir izahat vermək istəyirəm. 1993-cü ildə Rusiya imperiyası Azərbaycanda vətəndaş müharibəsi salmaq planlaşdırırdı. Bu qırğının qarşısını almaq mümkün deyildi, çünki ölkədə qüvvələr hissələrə bölünmüşdülər. İndi o qüvvələrin bir hissəsi həbsxanadadır, bir hissəsinin də rəhbəri H.Əliyevin özüdür. Mən H.Əliyevi hakimiyyətə dəvət edəndə bunu nəzərə aldım. Onu gətirib hakimiyyətə şərik edirsən ki, qan tökməsin. Başqa yol yoxdur.

Keçmiş Sovet hökumətini bərpa etmək istəyənlər belə qırğınlar hazırlamışdılar - Tacikistanda, Gürcüstanda, Azərbaycanda, Qırğızıstanda, Moldovada vətəndaş müharibəsi salmaq, keçmiş SSRİ-də qan töküldüyünü deyərək sonradan onu bərpa etmək. BİZ VƏTƏNDAŞ MÜHARİBƏSİNDƏN ÇIXMALI İDİK VƏ ÇIXDIQ!" (Ə.Elçibəyin 3 oktyabr 1998-də Ümumrespublika forumundakı nitqindən).

Niyə məhz H.Əliyevlə birləşməyə üstünlük verdiniz - başqalarıyla olmazdımı?

Başqaları qiyamı yatırtmağı bacarmayacaqdı.

Hökmən qan töküləcəkdi?

Yox, söhbət qan tökülməkdən getmir. Sadəcə, başqaları cəmiyyətə təsir göstərə biləcək fiqurlar deyildi. Axı onun yerində kim olaydı? Ayaz Mütəllibov gəlsəydi mütləq Rusiyanın qoşununu da arxasınca gətirəcəkdi. O deyirdi ki, mən 50 faiz moskvalı, 50 faiz azərbaycanlıyam. Belə adamla necə birləşəsən? Başqa kimi deyirsiniz?

Məsələn, Surət Hüseynovu. Hər halda, onun özü prezident olmaq iddiasındaydı.

-Surət Hüseynov müdafiə nazirinin müavini olmaq istəyəndə mən onu heç ora layiq bilmədim. Axı o, kimdi, haranın adamıydı ki, vətəndaş müharibəsinin qabağını alaydı? O, bir piyadaydı, əldə oyuncaqdı.

Ümumiyyətlə, Əbülfəz bəy, Kələkidə olduğunuz müddətdə indiki iqtidarın legitimliyini qəbul etməmisiniz. İndi bu məsələyə və ümumən H.Əliyev iqtidarına münasibətiniz?

Biz hakimiyyətdən hərbi qiyam yoluyla uzaqlaşdırılmışıq. Bunu təşkil edən qüvvələrə gücümüz çatmadı. Sonradan bu hərbi qiyam siyasi qiyamla parlamentdə başa çatdırıldı və Heydər Əliyev hakimiyyəti qeyri-qanuni olaraq qəsb etdi.

Axı onu Siz dəvət etmişdiniz?

Onu Ali Sovetin sədri kimi çağırmışdıq. Daha deməmişdik ki, gəlib prezident hakimiyyətini ələ keçir. O, məni hakimiyyətdən uzaqlaşdırmaqçün qanunsuz referendum keçirdi, halbuki referendum hüquqi deyil, siyasi aktdır - referendumla prezident çıxarılıb prezident qoyulmaz.

Əslində bu ideyanı da özünüz vermişdiniz - Kələkiyə getməzdən bir-iki gün öncə Prezident Aparatının qarşısındakı mitinqdə bildirmişdiniz ki, prezidenti hakimiyyətdən kənarlaşdırmaqçün referendum keçirilməlidir. Əliyev də referendum keçirərkən həmin sözlərinizə söykəndi...

Referendumun bu məsələdə nə dərəcədə səlahiyyətli olub-olmaması məsələsini hələ bir qırağa qoysaq belə, axı onun aparılması da tam qanunsuz olub, belə ki, hakimiyyətinin taleyi həll edilən prezident, yəni mən hökmən həmin tədbirdə iştirak etməli, sərbəst olaraq təbliğat aparmalıydım, ancaq buna qətiyyən imkan verilmədi. Prezident səlahiyyətlərinə yiyələnmiş H.Əliyev sonra qanunsuz referendumun saxta nəticələri əsasında yenə qanunsuz olaraq yeni

prezident seçkiləri təyin etdi, öz namizədliyini irəli sürdü və çox çəkmədən az qala 100 faizli nəticəylə özünü prezident elan etdi.

Yeri gəlmişkən, prezidentlik səlahiyyətlərinizin müəyyən hissəsini də H.Əliyevə özünüz vermişdiniz axı?

Mən kənddə olarkən barışıqçün prezident səlahiyyətlərimin müəyyən hissəsini Ali Sovetin sədrinə verməyi, müəyyən hissəsini də prezidentdə saxlamağı məqsədəuyğun saydım. Düşündüm ki, ikimiz birlikdə işləyərək Azərbaycanı bu bəlalardan çıxara bilərik. Amma Əliyevin hakimiyyət iştahı o qədər dərinləşdi ki, bununla razılaşmadı və yerdə qalan səlahiyyətləri də tam qanunsuz olaraq mənimsədi və sonra da dediyim qayda üzrə hakimiyyəti bütövlükdə qəsb etdi. Məhz bu səbəbdən də AXCP və Müsavat onun hakimiyyətinin legitimliyini indiyədək tanımayıb.

"Doğrudan da qətiyyətlisənsə sənin haqqında hər şey deyiləcəyini gözünün qarşısına alıb özünü ümumi məqsəd yolunda qurban verməyi bacarmalısan"

Bəy, istər Siz iqtidardaykən, istərsə də iqtidardan gedəndən sonra, məncə, eyni mərkəzdən idarə edilən qüvvələr ictimai rəyə inadla bu fikri aşılamağa çalışıb ki, Elçibəy qətiyyətsizdir, onu idarə edirlər, o, qərar qəbul etməyə qadir deyil və s. Siz "qətiyyətli" olsaydınız Azərbaycanda Əfqanıstan və ya Tacikistan qarşıdurması yarana bilərdimi, yaxud Sizin şəxsi taleyinizdə də Zviad Qamsaxurdia, ya da Cövhər Dudayev faciəsi təkrarlanardımı? Yoxsa tamam başqa bir ictimai-siyasi durum yaranardı?

Birincisi, "qətiyyət" anlayışının meyarlarını müəyyənləşdirmək lazımdır. Qətiyyət hansı anlarda olur, haçan olmur? Bir var gedirsən döyüşə, ordunu da batırırsan. Bu nə qətiyyətdir? Belə ağılsız qətiyyət kimə lazımdır? Bir də var ki, ordunu vaxtında geri çəkdin, sağ saxladın, məhv olmağa qoymadın və sonradan yenidən döyüşə hazırladın. Sənin haqqında düşmənlərin "geri çəkildi", "qorxub qaçdı" deyəcəklər, ancaq "qorxub qaçdı" sözünün üstündən aşmaqçün də qətiyyət lazımdır - gərək onu götürə biləsən. Səni hər yerdə söyəcəklər, dözülməz mənəvi-psixoloji əzab verəcəklər, səni "qorxaq" adlandıracaqlar, amma hünərin var, götür bunları boynuna, get və siyasəti düzgün həll elə. Mən "Qamsaxurdia qətiyyəti"ylə hərəkət etsəydim - Azərbaycanı vətəndaş müharibəsinə salıb özüm də ölsəydim o qətiyyətə siz necə qiymət verərdiniz? Bu, qətiyyətdirmi? Xalqımı qurban verəcəyəm ki, qətiyyətliyəm?!

İnsanların beynində hərdən belə psixoloji an yaranır ki, filankəs qətiyyətli deyil; məsələn, Fransanın prezidenti Jak Şirak qətiyyətli adam deyil, ancaq Səddam Hüseynə söz ola bilməz. Bir çoxlarının düşüncəsinə görə, diktatorlar qətiyyətlidir - Lenin qətiyyətlidir, Stalin qətiyyətlidir, Hitler qətiyyətlidir, Mussolini qətiyyətlidir. Kim baş kəsib adam öldürübsə o, qətiyyətli sayılır. Yox, heç də belə deyil. Qətiyyətlilik odur ki, sən hər cür əzab-əziyyətdən keçərək xalqın xoşbəxtliyi uğrunda sonadək çalışasan! Burada bəzən sən öz şəxsiyyətini də qurban verməli olursan - sənin şəxsiyyətin itir, xalqın vahid ruhunda əriyir. Doğrudan da, qətiyyətlisənsə sənin haqqında hər şey deyiləcəyini gözünün qarşısına alıb özünü ümumi məqsəd yolunda qurban verməyi bacarmalısan.

Məsələn, götürək sufiləri. Onların qətiyyəti olmayıb? Nə qədər əzablara, işgəncələrə dözərək bir tikə çörəklə yaşayıblar, "rizq Allahdandır" deyiblər. Əksinə, dünyanın ən qətiyyətli adamları onlardı - haqqın yoluyla gediblər. Onlar öz şəxsiyyətlərini önə çəkməyiblər. Kimdi onlar? Təsəvvür edin ki, bir sufi dərviş bütün ölkəni gecə-gündüz gəzərək oxuyur: "ya haqq", "ya haqq", "ya haqq"... Onun özünün heç nəyi yoxdur - çöldə gəzir, xarabalarda yatır, ac-susuz qalır, ancaq dönmədən Haqqı insanların beyninə yeridir. İndi demək olarmı ki, o, qətiyyətsiz adamdır?! Əksinə, çox qətiyyətlidir. O, baş kəsmək yox, Haqqı anlatmaq istəyir. Kim də Haqqı çox sevirsə, Haqqı daha çox müdafiə edirsə qətiyyətli adam odur!

Qətiyyətli adamlar imperatorlar deyil. Mənə ordu verin, gedim kimisə əzim. Buna nə var ki, hamı edər. Qətiyyət qan tökməklə ölçülməz. Gəncədə tərksilah edilməli 500 adam - bir batalyon vardı. Onları topla elə yatdıqları yerdəcə batırmaq olardı. Bəs sonra bunu hansı Haqqa yazacaqdıq? Xalqa necə izah edəcəkdik? Bu 500 adamın içərisində, deyək ki, 30-u günahkardı. Qalanları əmrə tabe olub. Onları qırandan sonra özümüzə necə, hansı adla haqq qazandıra bilərdik?! Mən, doğrusu, buna cavab tapa bilmirəm.

Cinayətkarı tapıb onun özünə cəza vermək lazımdır. Surət Hüseynovu həbs etməkçün gərək bir 300 nəfəri qıraydıq; axı o 300 nəfərin günahı yoxdu! Bəs bu qiyam sonradan böyüyüb vətədaş müharibəsinə çevriləndə nə etməli? Mən, Qamsaxurdianı bacarıqlı adam sayıram. Böyük şəxsiyyətdi - gürcü xalqının azadlığı uğrunda dönmədən mübarizə aparıb. Amma vətəndaş müharibəsində qətiyyətli ola bilməzsən. Vətəndaş müharibəsində qətiyyətlilik dəlilikdir. Öz əsgərini öldürmək, öz vətəndaşını öz vətəndaşına qırdırmaq, üstəlik, qıran vətəndaşa Milli Qəhrəman adı da vermək xəstə insanın psixologiyasıdır.

Tutaq ki, mən lap əmr verdim, deyək 500 nəfər 500 nəfərlə vuruşdu. 100 nəfər bu tərəfdən, 200 də o tərəfdən qırıldı. Qalib gəldik. Amma bu qırılanın hamısı Azərbaycan xalqının övladları deyilmi?! Bu, aksiomdur - insan ağlının, milli şüurun ən inkaredilməz aksiomudur ki, vətəndaş müharibəsinin qalibi olmur, qurtardı! Kim özünü qalib sayır saysın! Vətəndaş müharibəsinin qətiyyətlisi olmur! Kim özünü qətiyyətli sayır saysın!..

Dövlət başçısı öz qətiyyətini ölkəsinin, dövlətinin içində - öz vətəndaşlarına yox, çölündə - düşmənlərinə göstərməyi bacarmalıdır!

Bir Türkiyə generalının belə sözü var ki, igid adam vətən uğrunda, xalq uğrunda öz həyatını qurban verən yox, onların yolunda öz şərəfini, təmiz adını qurban verəndir. Siz Kələkiyə gedəndə şərəfinizi qurban verəcəyinizi görürdünüz?

Çox qabaqcadan görürdüm.

Deməli, özünüfədaya qəsdən gedirdiniz?

Qəsdən gedirdim, bilə-bilə gedirdim. Mənə heç nə lazım deyildi. İstəyim bircə oydu ki, vətəndaş müharibəsi olmasın, soydaşlarımız, qandaşlarımız bir-birini qırmasın. Mənimçün orada şərəfdən söhbət gedə bilməzdi. Mənimçün hər şeydən öncə VƏTƏN və MİLLƏT'di!

İstədiyinizə çatdınız?

Bəli! Mən istədiyimə çatdım. Tarixə bir daha sübut edəcəyəm ki, mən ən doğru olan fenomenal bir addım atmışam! Onun izahını sonra verəcəyəm.

"Yeni dövlət qurmaqda və onu demokratik üsullarla idarə etməkdə mən Heydər Əliyevdən on qat səriştəliyəm!"

Bəy, Sizi prezident və bizi iqtidar olaraq səriştəsizlikdə suçlandırmağa indiki iqtidar nə qədər haqlıdır? Ümumiyyətlə, bu "səriştəsiz" terminінə münasibətiniz?

Bunların hamısı indiki iqtidarın ortaya atdığı boş sözlərdir. Mənim haqqımda iki şeyi xalq həmişə deyir: birincisi, qətiyyətsizdir - özü idarə etmir, onu idarə edirlər; ikincisi, qorxdu, qaçdı Kələkiyə. Budur mənim üstümdə qalan ittihamlar. Onlara da cavab verəcəyəm, qoy nə deyirlər desinlər. Qaldı ki səriştəsizliyə, bu məsələni artıq bir dəfə izah etmişəm.

Bizim kadrlarımız doğrudanmı səriştəsizdilər?

Xeyr, elə deyil. Ola bilsin ki, dövlətin müəyyən mexanizmlərini köhnə üsullarla idarə etməkdə Heydər Əliyev məndən səriştəlidir, bunu qəbul edirəm. Ancaq yeni dövlət qurmaqda və onu demokratik üsullarla idarə etməkdə mən Heydər Əliyevdən on qat səriştəliyəm! Bu, bir.

H.Əliyevin indiki kadrlarıyla müqayisədə bizimkilər hər baxımdan yüz dəfə üstündür - həm demokratik idarəçilikdə, həm vicdanlılıqda, həm dövlətçiliyə sədaqətdə, həm də mənəvi-əxlaqi təmizlikdə. Bunların kadrı yoxdur. Qoy 10 nəfər kadr bunlar çıxarsın, 10 nəfər də mən, oturub üz-üzə söhbət etsinlər. bunlar idarəçilik nədir bilmirlər; yalnız onu bilirlər ki, rüşvət alıb rüşvət versinlər, vəzifələrini saxlasınlar, kim güclüdürsə ona yaltaqlanıb kim zəifdirsə onu əzsinlər. Vəssalam. Sistemləri budur. Bunlara "kadr" deyəndə mənim gülməyim gəlir. Çağdaş elmə azca da varsa yiyələnmiş adamlar bunları kadr sayırsa vay bu millətin halına, yazıqlar olsun bu xalqa! Bunlar kadr deyil, aşağıdan oğurlayıb yuxarı ötürən bir sürü oğru dəstəsidir. Yuxarı çığıranda "ləbbeyk" deyirlər, aşağını da döyürlər, əzirlər.

Minlərcə belə heyvərə hökumət olub dünyada. Buna "cahil cəmiyyət" və "cahil hökumət" deyirlər. Bizim iqtidar dövründəsə şüurlu cəmiyyət vardı. Bu cəmiyyətin içindən yararlı bir təbəqə seçilmişdi. Onlar yeni, azad, müstəqil dövlət qurmaq istəyən namuslu, fədakar vətəndaşlardı. Vətəni hədsiz sevirdilər, onun yolunda ölümə hazırdılar, azadlığı hər şeydən üstün tuturdular, onun uğrunda məqsədyönlü mübarizəyə girişmişdilər. Onlar şüurlu, yaradıcı, təşəbbüskar, təmiz niyyətli insanlardı və başlanğıcda təcrübələri hələ yetərincə olmasa da cəmiyyəti ləyaqətlə idarə etməyə başladılar.

Bəs sonra nə oldu? Bizi daxili və xarici güclər aradan götürdülər, başqa yerdən cəmiyyətə üstqurum gətirdilər və həmin üstqurum başladı bazisi əzməyə, onu şüursuz, qorxaq etməyə, alçaltmağa, vətəni satmağa təhrik etməyə. Onlarla bizim başlıca fərqimiz, bax, budur.

Biz indi yenidən bu cəmiyyətin içərisinə gedib onun keçmiş mübariz ruhunu qaytarmalı, onu yenidən şüurlu, mübariz vətəndaşlar taplumuna çevirməli, onun inkişafına mane olan çürümüş, rüşvətxor üstqurumu götürüb atmalıyıq.

"Mən aliməm, sosioloqam. Zamanın gedişini qabaqcadan görüb deyirəm..."

Öz hakimiyyəti dövründə Qarabağ məsələsini nəinki həll etməyən, hətta Kəlbəcəri də itirən prezidenti Çin sərhədinədək türk bayraqlarının dalğalanacağını iddia etməkdə günahlandıranlar indinin özündə də az deyil...

Məsələni nədə dolaşdırırlar? Bəli, mən bir prezident kimi Qarabağı qurtarmalıydım və onun uğrunda da mübarizə aparırdım. Düzdür, Kəlbəcəri itirdik, ancaq iki rayonu da geri aldıq. Qarabağı qaytara bilməməyimizə və Kəlbəcəri itirməyimizə görə, bəli, xalq bizi qınamalıdır - bu qınaq düzdür. Ancaq Çin sərhədlərinə qədər türk bayraqlarının dalğalanacağını mən bir tarixçi kimi deyirəm.

Alim Əbülfəzlə prezident Əbülfəzi qarışıq salırlar. Mən aliməm, sosioloqam. Zamanın gedişini qabaqcadan görüb deyirəm ki, ay camaat, bir zaman gələcək, Çində türk bayrağı dalğalanacaq. Həqiqətən də, Çinədək bu bayraqlar dalğalandı. Çində 40 milyon uyğur öz bayrağını qaldırıb. Bu gün dünyada 27 türk bayrağı dalğalanır. Mən bunu neçə il qabaqdan deyirdim.

Ancaq Siz bunu deyəndə dünyada tək bir türk bayrağı vardı.

O zaman, bəli, yalnız Türkiyənin bayrağı vardı. Sizi inandırıram ki, gələcəkdə bu bayraqlar 33-ə, 35-ə çatacaq. Harada əzilən türklər varsa orada onlar bayraqlarını qaldıracaqlar. Düzdür, Azərbaycanın Güneyində yeni bayraq yaranmayacaq - oraya bu bayraq gedəcək. Amma ola bilsin, İranın lap cənubunda yaşayan qaşqaylar öz bayrağını qaldıracaq. Çində 5-6 türk xalqı yaşayır. Bəlkə onlar ümumi bayraqdan başqa öz bayraqlarını da qaldıracaqlar, çünki türk xalqı bir qövm kimi öz sancağı olan xalqdır.

Təsəvvür edin ki, orta əsrlərdə türklərin dövlət bayrağından savayı hər tayfanın da öz bayrağı, hər birinin öz gerbi - damğası da olurdu. Bu, türk ruhunun müstəqilliyə, azadlığa can atmasından irəli gəlir - dövlətimiz böyükdür, əlbəttə, olmalıdır, amma bizim ərazi, bizim tayfa da qüvvətli olmalıdır! Buna nə sultan, nə xaqan bir söz deyir. Nə olar - sənin də bayrağın olsun, döyüşə öz ordunla, öz bayrağınla gəl! Tayfa, yaxud elat yaylağa qalxanda bayrağını sancırdı ki, bu örüş mənimdir. Həmin örüşə bayraq gəlib çıxmasa xan icazə verirdi ki, oraya filan tayfa gəlib öz bayrağını sancsın, heyvanlarını orada otarsın.

Qədimdə beləydi. İndi türk bayraqlarının çoxluğu adamları niyə xofa salır?

Mən deyəndə ki Skandinaviyanın ən qədim əhalisi türklərdir, inanmırdılar. Bu yaxınlarda mənə XII əsrdə Skandinaviyada tərtib olunmuş bir sənəd göstərdilər. Skandinaviya dilindən rus dilinə tərcümə olunub. Orada yazılır ki, "bu yerin, bu ölkənin əhalisi Asiyadan gəlmiş türklərdir". XII əsr, Skandinaviya mətni, Skandinaviya dilində. Buna nə deyirsiniz? Mən deyəndə oluram dəli, amma Skandinaviya alimi deyəndə böyük kəşf sayılır.

Bilirsiniz, hələ türkün özüyçün və dünya üçün nə olduğunu, türk tarixinin nə olduğunu hələ çox adam bilmir. Türk bir zaman o qədər güclü olub ki, türk inanca çevrilib. Təsəvvür edin ki, islam dini, xristian dini necə bir inancdırsa türk özü də elə bir inancdır - türk inancı! Başqa xalqlar da onu qəbul edirdilər. Türk inancı artıq millət adından çıxaraq bir sistem, idarə və əxlaq kimi bir ideyaydı.

Əbülfəz bəy, türk bayraqlarıyla bağlı öncəgörmənizin açıqlaması maraqlıdır. Ancaq opponentləriniz Sizi başqa ehtiyatsız öncəgörmələr irəli sürməkdə də suçlayırlar. Məsələn, bildirirlər ki, Siz hələ 1992-nin martında MDB-nin vur-tut 6 ay ömrü olacağını söyləyirdiniz, halbuki o, artıq 6 ildir yaşayır.

Bəli, mən deyirdim ki, MDB ölü doğulmuş uşaqdır və ya nizamnaməsi olmayan kolxozdur; o yaşamayacaq, dağılacaq. Həmin vaxt, doğrudan da, elə oldu. Biz MDB-yə girmədik, Gürcüstan çıxdı, bir sıra dövlətlər çıxdı. Sonra yenidən qaytardılar MDB-yə. Bu, bir.

İkincisi, MDB əslində yenə də ölüdür. Onun heç bir şeyi yoxdur. Onun üzvlərinin özləri etiraf edirlər ki, qəbul olunmuş neçə yüz sənədin heç biri işləmir. Bu, "yaşamaq" demək deyil axı. Rusiya onu, sadəcə olaraq, bir forma kimi saxlayır (Belarusun da marağı var) ki, lazım gələrsə keçmiş Sovet respublikalarının başına vurmaqçün toppuz kimi istifadə edilsin. Ancaq bu da mümkün deyil. Rusiya bu gün öz içərisində Çeçenistanı idarə edə bilmirsə hansı ölkə, hansı respublika axmaqdır ki, MDB-nin xəttiylə təzədən Rusiyanın təsiri altına girsin? Sadəcə olaraq, vaxtaşırı yığışıb iclas keçirirlər. Yadınızdadırsa hər 6 aydan bir MDB-nin başçısı dəyişilməliydi, ancaq indiyə kimi Yeltsindir. Onu da Kişinyov sammitində Ukrayna, Moldova və Gürcüstanın prezidentləri, Azərbaycanın dövlət başçısı şil-küt elədilər. Moskva bundan yaman acığa düşdü. Axırda nə dedilər? İfadəyə baxın: biz hamını başa düşürük, ancaq H.Əliyevlə E.Şevardnadzeni başa düşmürük. Moskva anlaya bilmirdi ki, onun hakimiyyətə gətirdiyi adamlar niyə indi ona qarşı çıxırlar.

Siz Yuqoslaviya, Çin və İranın yaxın vaxtlarda parçalanacağını bildirirdiniz. Ancaq onlardan hələlik yalnız Yuqoslaviya dağılıb.

Yuqoslaviya dağıldı, göz qabağındadır. Çində də tibetlilər özlərini tam müstəqil sayırlar - Çin hələ bunu qəbul etməsə də. Ancaq ABŞ və Fransa Çindən Tibetin müstəqilliyini tanımağı tələb edirlər. Onun Dalay-laması gah Amerikada olur, gah Hindistanda. Doğrudur, o, ölkəyə gedə bilmir, ancaq xalq Çin hökumətini tanımır, yalnız öz Dalay-lamasını eşidir. Bu, artıq yarımmüstəqillikdir.

İkincisi, son vaxtlar Doğu Türküstanda, bildiyiniz kimi, uyğur türkləri ayağa qalxdılar. Orada məsələ nə cürdür? Paytaxtı Urumçi şəhəri olan Sincan əyalətinin tam muxtariyyəti var: özünün idarəetmə sistemi, məktəbləri, dini mərasimləri və s. Uyğurlar Çinlə tamamilə uyuşmaz haldadırlar. İndi azadlıqları uğrunda mübarizə aparırlar və buna nail olacaqlar. Çinin dağılması prosesi oradan başlanacaq. Hindistanın adını mən ən sonda çəkmişəm. Çünki orada müəyyən qədər demokratiya var, ayrı-ayrı ştatlar tam müstəqildirlər, sadəcə olaraq dövlət qurumu birdir. Ştatların özünün büdcəsi, idarəetməsi, daxili siyasəti müstəqildir. Yalnız ordu və XİN birdir, vəssalam. Qalan şeylərdə tam daxili müstəqillik var. Belə yarımdemokratik ölkədə parçalanma gec gedir. İrana gəlincə, SSRİ, Yuqoslaviya necə dağıldısa İran da eləcə parçalanacaq.

Buna əminsiniz?

Əlbəttə, əminəm. Yaxın illərdə bunu görəcəksiniz.

Siz Ermənistanla sərhədlərimizin möhkəm kəsilməsini Qarabağ münaqişəsinin həllində həlledici amil sayırdınız. Deyirdiniz ki, belə edilsə Qarabağ məsələsi həll olunacaq.

Bəli, çox düzdür. O sözü demişdim və indi də o fikirdə gedirəm. Buna görə də Goranboyu, Ağdərəni götürəndən sonra ordunu yeritdik Laçına. Laçında kəndlərin hamısını qaytardıq və dəhlizə keçdik - Laçını da alıb dəhlizi bağlamalıydıq. Biz iki gün Laçını mühasirədə, yolu atəş altında saxladıq. Həmin vaxt Ermənistan qərar çıxardı ki, Xankəndi köçürülsün. Biz dəhlizi bağlaya bilsəydik məsələ 1-2 aya həll olunub qurtaracaqdı.

Bəs niyə həll olunmadı?

Həmin anda Rusiya bunu gördü. Ermənistandakı batalyonlarını Azərbaycan qüvvələrinə qarşı atdı, Azərbaycan geri çəkilməyə məcbur oldu - qüvvələr qeyri-bərabərdi.

Sizin İranı və onun başçılarını açıq-aşkar tənqid etməyinizi indi də bir çoxları siyasətdə səriştəsizliyin nəticəsi kimi qələmə verməyə çalışır.

Çox gözəl deyirsiniz. Mən Əliəkbər Haşimi-Rəfsəncanini hakimiyyətdə olanda tənqid edirdim, indisə onu hələ xarici ölkələr bir yana, bütün İran xalqı tənqid edir. Deməli, mən qabaqcadan onun qiymətini düz vermişəm.

Amerika İranı irticaçı yox, cinayətkar rejim elan edib. Bir var sivilizasiyalı, mütərəqqi rejim, bir də var cinayətkar rejim; dünyanın bir çox dövlətləri də bu fikrə qoşulublar ki, İranda cinayətkar rejim hökm sürür.

Bu cinayətin mahiyyəti nədədir?

Xalqlara azadlıq verilmir, ölkədə hərbi-polis diktaturası hökm sürür, vicdan azadlığı, söz azadlığı yoxdur - kim müxalif söz desə onu asır, qətlə yetirirlər. Dinimizin hökmünə görə, qız uşağı dar ağacından asılmaz. Ancaq İran nə edir - hökumətin əleyhinə danışdığına görə gecə onu zorla ərə verərək qızlığını alıb ertəsi gün asırlar! Bundan böyük cinayət ola bilərmi?! Yaxud cinayət etmiş hər hansı adamın boğazına məftil keçirib krandan asır və onu şəhərin küçələrində beləcə gəzdirirlər! Bu cür vəhşilik nə Qur’anda var, nə dində, nə də imanda. Belə allahsız rejim yaşaya bilməz! Cinayətkara, əlbəttə, cəza verilməlidir, amma görəndə ki onu boğazdan asıb bir heyvan ölüsü kimi küçələrdə gəzdirirlər, insan istər-istəməz bunu edən hökumətə, buna fitva verən din xadimlərinə nifrət edəcək. Görün o asılmışın anası, bacısı nə dəhşətli hallara düşəcək! Buna heç kim dözə bilməz. Belə rejim cinayətkar deyil, bəs nədir?! Özünün varlığını saxlamaqçün ən adi insan hüquqlarını pozur, öz vətəndaşlarını daim qorxu içərisində saxlayır. Bəli, günahkara ən ağır cəza ver, ancaq onu küçələrdə gəzdirib adamların gözünün odunu almağa çalışırsansa artıq insan haqqını pozursan. İnsana təkcə öz günahına görə yox, başqalarını qorxutmaqçün cəzalar verilməsi nə üçündür? Ədalətsiz dövləti, rejimi qoruyub saxlamaqçün!

Yaxud başqa faktı götürək. Parlament qərar çıxarır ki, onun komissiyası gedib maliyyəni yoxlasın. Buna, məsələn, 1 il vaxt verilir. Gedir, 1 ildən sonra gəlir ki, biz tapşırılan işin cəmi 40 faizini yoxladıq, 60 faizi qaldı. Soruşanda "niyə?", deyir ki, bizi yoxlamağa buraxmadılar, icazə vermədilər. Baxın, dövlətin ali məqamı, qanunverici orqanı qərar çıxarır, onu yerlərdə saymırlar. Deməli, bu dövlət çürüyüb.

Ya da bir ali ruhani minbərə çıxaraq deyir ki, cənnətdə fars dilində danışacaqlar, siz də gərək fars dilini öyrənəsiniz. Xalqın ağsaqqalı, ruhanisi sayılan bu adam xəstədir. Belə adamlarla dövlət, ölkə hara gedəcək? Onlar bizə qoca, çənəsi əsən, ağlı işləməyən Brejnevi, Çernenkonu xatırladırlar; həmin xəstə şəxslər guya Sovet hökumətini idarə edirdilər. Belə rəhbərləri olan dövlət həmişə çökür.